© *"Metafizika" Journal* *p-ISSN 2616-6879*
*Vol 6, issue 2, serial 22, 2023. pp.132-137* *e-ISSN 2617-751X*

# RESENZİYA

**MJ №** 175

## "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I cild)" kitabı haqqında dəyərləndirmə

**Məhəmmədəli Məlikov***




**Kitabın adı:** Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I cild)
**Müəllif:** Nağdəli Zamanov
**Kitabın dili:** Azərbaycan dili
**Nəşr ili:** 2013
**Səhifəsi:** 480
**Nəşriyyat:** Elm və təhsil
**Ölkə:** Bakı, Azərbaycan
**ISBN** 978-9952-8176-8-3

### 1.Giriş

Nağdəli Zamanov 1961-ci ildə Kəlbəcər rayonunun Keştək kəndində anadan olmuşdur. 1979-1985-ci illərdə ATİ-nin II müalicə profilaktika fakultəsində təhsil almışdır. 2012-ci ildən "Qızıl qələm" mükafatı laureatıdır və həmçinin Azərbaycan aşıq poeziyasının inkişafında xüsusi xidməti və aşıq poeziyasında uğurlar qazandığı görə isə "Aşıq Ələsgər-200" yubiley medalı ilə təltif edilmişdir.

### 2.Nağdəli Zamanovun əsərləri

Alim "Sosial-siyasi elmlər" seriyasına daxil olan çoxsaylı əsərlərin müəllifidir. "Daxili xəstəliklərə dair izahlı testlər" [Bakı, 2000, 244 səh.], "Naməlum etiologiyalı qızdırma" [Bakı, 2001, 125 səh.] adlı əsərləri tibb sahəsinə aiddir. "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" (I cild) [Bakı, 2013, 480 s.], "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" (II

* ADİU-nin tələbəsi, Bakı, Azərbaycan
E-mail: mma.malikov0@gmail.com
https://orcid.org/0000-0002-4201-9012

**Resenziyanın tarixçəsi:**
*Resenziya redaksiyaya daxil olmuşdur: 04.01.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 20.02.2023*
*Çapa qəbul edilmişdir: 06.06.2023*

cild) [Bakı, 2014, 496 s.], “Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” (III cild), [Bakı, 2018, 520 s.], “Aşıq Şəmşir yaradıcılığında fəlsəfi fikirlər” [Bakı, 2018, 512 s.], “Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” (IV cild) [Bakı, 2020, 544 s.] adlı əsərləri isə bədii məzmunludur. Müəllifin 15-ə yaxın məqaləsi müxtəlif jurnallarda nəşr olunmuşdur.

**3.Kitabın əhəmiyyəti haqqında**

“Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” kitabı Azərbaycan nitq mədəniyyətinin inkişafına həsr olunan azərbaycan dilində yazılmış əsərdir. Bu kitabda ulu öndər Heydər Əliyevin nitq və çıxışları kompleks şəkildə araşdırılmışdır.

Monoqrafiya bir çox elm sahəsində fəaliyyət göstərən və ya təhsil alanlar üçün vəsait kimi istifadə oluna bilər.

**4.Əsərin quruluşu və bölmələri**

“Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” kitabı 4 cilddən ibarətdir.

Müəllif I cilddə Heydər Əliyev nitqlərinin ekspressivliyini gücləndirən nitq ünsürlərini (fəlsəfi fikirlər, səmimiyyət, qətiyyət, nikbinlik, proqnozlar, poetik duyğular), üslubları (elmi- publisistik, məişət, dini) şərh etmişdir. I cild ümumilikdə 14 fəsildən ibarətdir:

“Heydər Əliyev Azərbaycan dilinin müdafəsində” adlanan I fəsil Heydər Əliyevin istər Sovet imperiyası, istərsə də müstəqillik dövründə Azərbaycan dilinin gənclərimiz tərəfindən sevilməsi, mənimsənilməsi, qorunması və inkişaf etdirilməsi uğrunda apardığı mübarizə haqqındadır. 2 fevral 1996-ci il Heydər Əliyevin tarixində Azərbaycan Respublikası gənclərinin Respublika Sarayında keçirilən birinci forumundakı çıxışını, buna misal olaraq göstərmək olar:

> *“Öz dilini bilməyən, öz dilini sevməyən adam öz tarixini yaxşı bilə bilməz. Xatirimdədir, 70-ci illərdə mən bir neçə dəfə çox narahatçılıqla göstərişlər verdim ki, rusdilli məktəblərdə Azərbaycan ədəbiyyatına çox yer verilsin. Azərbaycan ədəbiyyatını, ana dilini bilməyən gənc Nizamini oxuya bilməz, Füzulini oxuya bilməz, Nəsimini oxuya bilməz, Vaqifi oxuya bilməz, Sabiri oxuya bilməz, Cəlil Məmmədquluzadəni oxuya bilməz və digərlərini oxuya bilməz. Əgər onları oxuya bilməsə, o, tariximizi bilməyəcək; onları oxuya bilməsə, bizim mədəniyyətimizi bilməyəcək, mədəni köklərimizi bilməyəcək, milli-mədəni ənənələrimizi bilməyəcək. Onları bilməsə, o, vətənpərvər olmayacaq, onda milli vətənpərvərlik duyğuları, hissiyyatı olmayacaqdır”*[Heydər Əliyev (1998). Müstəqilliyimiz əbədidir (V cild). Bakı, Azərnəşr, s.320]

II fəsil "Heydər Əliyev nitq ilə izah edir" adlanır. Burada əsasən ümumilli liderin çıxışlarında auditoriya və tədbir növündən asılı olmayaraq hər bir sahə üzrə anlayışlar haqqında söhbət açılır.

"Heydər Əliyevin nitqində girişlər və sonluqlar" adlanan III fəsildə müəllif rəsmi görüşlərdə nitq və etiket qaydalarına riayət olunması, əsasən giriş və sonluq hissəsinə xüsusi diqqət yetirilməsini vurğulayır. Həmçinin burada misallardan da geniş şəkildə istifadə olunur. Məsələn:

> "*Beynəlxalq təşkilatlardakı nitqlərinin sonluqları çox vaxt tələblər şəklində qoyulur, "üz tutmaq" frazeologizmi ilə xahişlər olunur, "təşəkkür etmək"lə fikir bitir.*" [Zamanov, N. (2013). Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I kitab) Bakı, "Elm və təhsil", s.64]

Həmçinin bunu qeyd etmək lazımdır ki, kitabda qeyd olunan kimi rəsmi görüşlərin bir-birindən fərqli cəhərləri var və bunlar nitqdə də özlərini əks etdirir.

IV fəsil "Heydər Əliyevin nitqində məntiqi ardıcıllıq" adlanır. Burada müəllif ulu öndər Heydər Əliyevin çıxışılarında nitqinin məntiqi ardıcıllığını hərtərəfli misallar əsasında araşdırır və təhlil edir. Burada o, əvvəlki bölmədə qeyd etdimiz kimi, giriş və sonluqlara xüsusi diqqət yetirməyi, həmçinin çıxışlarda statistika və tarixdən sitatlar və istinadlar üzərində danışılmalı olduğunu qeyd edir və bunları nümunələrlə göstərir.

"Heydər Əliyevin nitqində fəlsəfi fikirlər" adlı V fəsildə müəllif Heydər Əliyevin öz fikirlərini və baxış nöqtələrini daha da dolğun şəkildə çatdırmaq üçün ən qədim elm və ya bütün elmərin yaranma mənbəyi kimi tanınan fəlsəfə elmindən və xüsusən də fəlsəfi fikirlərdən istifadə etdiyini qeyd etməklə dayanmır və bunlara nümunələr də gətirir. Müəllifin qeyd etdiyi kimi:

> *"Heydər Əliyev müdrikliyə elə müdrikcəsinə də tərif verir, müdriklik anlayışına, bu fəlsəfi anlayışa öz təfəkkürü işığında tərif verir: "...Müdriklik təkcə o insanların elmi, biliyi, təhsili ilə bağlı deyildir. Müdriklik insanın fitri istedadıdır, müdriklik həm də insanın həyatı dərk etməsi, gedən proseslərə düzgün qiymət verə bilməsi və ondan özü üçün lazımi faydalar götürməsidir"."* [Zamanov, N. (2013). Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I kitab) Bakı, "Elm və təhsil", s.156]

VI fəsil "Heydər Əliyev nitqində səmimiyyət" adlanır. Heydər Əliyevin səmimiyyəti və böyüklüyü təvazökarlığında, nəcib hərəkətlərində və xalqın qarışısında özünü borclu saymağındadır. Burada müəllif Heydər Əliyevin nitq və çıxışlarında səmimilik göstəricisi olan ifadələri və söz birləşmələrini qeyd edir. Məsələn: "*Sözün düzü*" ifadəsi səmimi etirafı daha da çox əks

etdirir, “*Mən açıq deyirəm*” fikri isə Heydər Əliyev nitqlərində qarşı tərəf üçün qaranlıq bir məsələnin qalmadığını göstərir və s.

“Heydər Əliyevin nitqində qətiyyət” adlı VII fəsildə əsasən Heydər Əliyevin nitqindəki qətiyyəti analiz təhlilə cəlb edilib. Buradan onun qətiyyətlə verdiyi bəyanatları bir neçə hissəyə ayırlıb. Bunlardan ən əsası ulu öndərin dövlətimizin müstəqilliyi və ərazi bütövlüyünün qorunması üzrə beynəlxalq miqyasda apardığı siyasətin sərt çalarlarla, geridönməz xarakterlə və qətiyyətli şəkildə etdiyi bəyanatlar və çıxışlardır.

VIII fəsildə “Heydər Əliyevin nitqində nikbinlik” mövzusuna nəzər salınıb, Şərhdə çıxışlardan misal gətirilərək ulu öndərin müstəqillik, müdafiə qüdrətinin yüksəlməsi, ictimai-siyasi sabitliyin bərpası və s. sahələrlə bağlı nitqində sadə və anlaşıqlı cümlələrdən istifadə edildiyi və nikbinliklə xalqa çatdırdığı vurğulanıb.

IX fəsil “Heydər Əliyevin nitqində proqnozlar” adlanır. Əsasən müəllif qeyd edir ki, ulu öndərin proqnozları bir gündə irəli sürülsə də dərhal onun icrasına başlanılmayıb. Heydər Əliyev proqnozlarını on, on beş il öncədən planlaşdırıb, üstündə uzun müddət düşünüb, korrektə edib və sonda müxtəlif çeşidli auditoriyalarda səsləndiribdir. Ümummilli lider öz xalqının onun fikir və ideyalarına inandığına əmin olmuş və bu planların reallaşması üçün bütün səylərini əsirgəməmişdir.

**X fəsil** “Heydər Əliyevin nitqində poetik duyğular” adlanır. Müəllif qeyd edir:

> *“...Böyük natiqin nitqində səmimiyyət, qətiyyət, nikbinlik, fəlsəfəlilik və s. ünsiyyət elementləri ilə yanaşı poetizmi də öyrənmək mümkündür. ...* ” [Zamanov, N. (2013). Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I kitab) Bakı, “Elm və təhsil”, s.330].

Müəllif bu fəsildə Heydər Əliyevin nitqində poetizmi haradan mənimsədiyi, poetik ruhun yaranması, çıxışlarında poetik ifadələr və söz birləşmələrindən, şairlərə və yazıçılara hörmətindən bəhs edib və bunlara bariz nümunələr göstərib.

> *“...29 oktyabr 1997-ci ildə Azərbaycan yazıçılarının X qurultayı ərəfəsində yaşlı nəsildən olan yazıçıların bir qrupu ilə görüşdə elə böyük natiqin öz dilindən eşidirik: “Mən sizinlə neçə saat istəyirsinizsə oturmağa hazıram. Çünki ədəbiyyatı o qədər sevirəm ki, ədəbiyyatla, şeirlə, bizim mədəniyyətlə görüşmək mənim üçün həmişə çox xoşdur*”*...*” [Zamanov, N. (2013). Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I kitab) Bakı, “Elm və təhsil”, s.330].

XI fəsil "Heydər Əliyevin nitqində elmi üslub" adlanır. Müəllif fəslin girişində qeyd edir:

> *"Elmi terminologiyalarla auditoriyalara yol açan, məntiqi təfəkkürə söykənən, ümumiləşdirmələrə və naticələrə gətirib çıxaran elmi üslub Heydər Əliyevin nitqində araşdırılmamışdır. Bu üslub Heydər Əliyevin beynəlxalq konfranslardakı, sessiyalardakı çıxışları əsasında öyrənilmiş, digər üslublarla əlaqəyə diqqət yetirilmşdir"* [Zamanov, N. (2013). Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I kitab) Bakı, "Elm və təhsil", s.338].

daha sonra isə bu üslüb üzrə Heydər Əliyevin çıxış və konfranslarını misallar əsasında analiz və təhlil edir. Aşağıdakı fikirlər buna parlaq misaldır:

> *"Elmi üslubun tələb etdiyi terminlərə geniş yer verilməsi Heydər Əliyevin bu çıxışında da özünü göstərir: "Milli müstəqillik", "söz, mətbuat, vicdan azadlıqları", "iqtisadi islahatlar", "millətçilik və separatçılıq", "təhlükəsizlik şurası", "xalqların öz müqəddəratını təyin etməsi", "qaçqınlar", "etnik münaqişələr", "qaçqın və köçkünlər", "beynəlxalq iqtisadi əməkdaşlıq", "beynəlxalq hüquq normaları" və s."* [Zamanov, N. (2013). Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I kitab) Bakı, "Elm və təhsil", s.389].

"Heydər Əliyevin nitqində publisistik üslub" adlı XII fəsildə müəllif Heydər Əliyevin çıxış və nitqlərində əsasən ədəbi dilin növlərindən biri sayılan nitqin publisitik üslubunu nəzərə almışdır. O, bu üslubun əlamətlərini belə qeyd edir:

> *"Bu üslubda digər üslubların əlamətlərindən- terminlərdən, bədii ifadələrdən, dəlil və misallardan və sair istifadə etmək mümkündür"* [Zamanov, N. (2013). Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I kitab) Bakı, "Elm və təhsil", s.407].

Bu fəsildə publisistik üslubun tərifindən əlavə Heydər Əliyevin çıxışlarından geniş nümunələr gətirilərək bu üslubun həm ictimai-siyasi, həm də milli-ictimai tərəflərindən misallar göstərilmişdir.

XIII fəsil "Heydər Əliyevin nitqində məişət üslubu" adlanır. Bu üslubda müəllif böyük liderin nitqlərindən nümunələr gətirərək bunu qeyd edir:

> *"Məişət üslublu nitqlərində Heydər Əliyevin cəsarəti, qorxmazlığı, xalqına olan sədaqəti, özü demiş "xalqın yolunda özünü qurban verməyi" kimi cizgiləri açıqlanır."* [Zamanov, N. (2013). Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (I kitab) Bakı, "Elm və təhsil", s.425].

XIV fəsildə müəllif "Heydər Əliyevin nitqində dini üslubun yeri" başlığı ilə önəmli məsələlərə toxunur. Fəslin girişində belə qeyd edilir:

"*Müxtəlif tədqiqatçılar nitqdə üslublara təsnifat verirlər ki, onların biri də dini üslubdur. Din ocaqlarında, dindarlar qarşısında çıxış və nitqlərə imkan verilmədiyi Sovetlər dövründə dini üslubdan danışmaq, təsnifatlarda dini üslubu ayırmaq mümkünsüz idi."* [Muradov B., Bayramov H. "Nitq mədəniyyəti". Bakı, 2008. səh.95]

Daha sonra isə bunlara Heydər Əliyevin nitqindən və istifadə etdiyi dini-elmi terminalogiya, ifadələr və söz birləşələrindən nümunələr gətirir.

**5.Yekun**

Yekun olaraq bunu qeyd edə bilərik ki, Nağdəli Zamanov "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasında Heydər Əliyevin çıxışlarında və nitqlərində girişlər, sonluqlar, ardıcıllıq, səmimiyyət, qətiyyət, ədəbi dil üslubları və Azərbaycan dilinin normalarının qorunması mövzuları barədə geniş araşdırma aparmış və bunların hamısını nümunələrlə oxucuya catdırmışdır.

Lakin bütün bunlarla yanaşı, fikrimcə, bu kitabı daha da ucaldan onun frazeologizmləri, söz birləşmələri və sinonimlərdən istifadə etməsi və onları misallarla oxucunun yaddaşına həkk etməsidir.

Baxmayaraq ki, kitab nitq mədəniyyəti sahəsini əhatə edir, lakin mövzuya uyğun olaraq, digər sahələrə də yönəlmiş və onları təhlil etmişdir.